UOT 619.576.33.576.851.48.615.779.9.

# QUŞÇULUQ TƏSƏRRÜFATLARINDA AYRILMIŞ KOLİBAKTERİOZ VƏ SALMONELYOZ TÖRƏDİCİLƏRİNİN ANTİBIOTİKLƏRƏ HƏSSASLIĞI

**M.S.MİKAYILOV, Q.M.MURTUZOV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Antibiotiklərin uzun müddət işlədilməsi kolibakterioz və salmonelyoz xəstəlik törədicilərinin kulturaları arasında onlara qarşı davamlı nəsillərin əmələ gəlməsinə, bu isə aparılan müalicə və profilaktika tədbirlərin, səmərəsinin aşağı düşməsinə səbəb olur. Bunu nəzərə alaraq, xəstəlik törədicilərinin kulturaları antibiotiklərə həssaslıq dərəcələri öyrənilmişdir.*

***Açar sözlər:*** *antibiotik, həssaslıq, amoksasilin, kolistin, gentamisin.*

Quşçuluq təsərrüfatlarında bir tərəfdən məhdud sahədə çoxlu miqdarda müxtəlif yaşda quşların toplanması və mütəmadi olaraq onların təzələnməsi, yemləmə və saxlama şəraitindəki qüsurlar, məhsuldar quşların stress amillərə və xəstəliklərə daha həssas olması, digər tərəfdən isə cücələrə ilk gündən antibiotiklərin verilməsi ilə əlaqədar mədə-bağırsağın faydalı mikroflorasının inkişafının dayandırılması nəticəsində quş orqanizmasının ümumi vəziyyəti və təbii müdafiə funksiyaları zəifləyir.Belə vəziyyətdə mikroorqanizmlə makroorqanizm arasında immunoloji tarazlıq pozulur, xəstəliklərin inkişafı və geniş yayılması üçün əlverişli şərait yaranır. Bütün bu göstərilənlər təsərrüfatlarda baytarlıq sanitariya və müalicə-profilaktiki tədbirlərin ciddi keyfiyyətlə aparılması və onların keyfiyyətinə laboratoriya müayinələri ilə nəzarət edilməsi tələb olunur.

Çoxlu miqdarda quş olan binalarda dərmanların fərdi tətbiqi quşların tutulması və dərmanın verilməsinə artıq xərc çəkilməsi tələb edir. Bundan əlavə dərman preparatlarının verilməsi quşları narahat etməklə güclü stresə səbəb olur. Ona görə də quşçuluqda əksər hallarda dərman preparatlarının dozası yemə və suya görə təyin edir.

Quşçuluq təsərrüfatlarında antibiotiklərin verilməsinin əsas məqsədi quş orqanizminin pozulmuş funksiyalarına kömək etməkdir. Ancaq V.V.Salautin (2004), F.B.Şirinov (2004) S.B.Lısko, N.F.Xamko, O.A.Sunsova (2006), S.S.Yakovlov, S.V.Lenov (2008), A.N.Borisenko, O.B.Novikova, A.V.Varyuxin (2011) öyrənmişlər ki, antibiotiklərin uzun müddət işlədilməsi xəstəlik törədiciləri arasında onlara qarşı davamlı nəsillərin əmələ gəlməsinə, bu isə aparılan müalicə və profilaktika tədbirlərin səmərəsinin aşağı düşməsinə səbəb olur.

Material və metodlar: Quş cəsədlərindən ayrılan xəstəlik törədicilərindən *E.coli, S.pullorum-gallinarum, S.enteritidis və S.tyrhi murium* kulturaları *provaseptol, doksasilin, amoksasilin, kolistin, və gentamisinə* həssaslıq dərəcəsi öyrənilmişdir.

Kolibakterioz və Salmonelyozların törətdikləri xəstəliklərin kulturaları antibiotiklərə qarşı həssaslığını təyin etmək üçün disk üsulundan istifadə edilmişdir. Bu zaman mikrob əleyhinə antibiotikləri tətbiq edərkən xəstəlik törədicisinin həmin antibiotikə həssaslıq dərəcəsi nəzərə alınmışdır. Bunun üçün laboratoriya testlərindən istifadə olunmuşdur.

Kolibakterioz və Salmonelyoz törədicilərinin antibiotiklərə qarşı həssaslıq dərəcəsini təyin etmək üçün Ət Peptonlu Aqar (ƏPA) qida mühitindən istifadə edilmişdir.

Alınmış nəticələrin müzakirəsi: Tədqiqat işləri 2015-2016-ci illərdə BETİ-nin Quş xəstəlikləri şöbəsində quşçuluq təsərrüfatlarından ayrılmış xəstəlik törədicilərinin üzərində aparılmışdır.

Bu məqsədlə tədqiqat apardığımız quşçuluq təsərrüfatlarından 173-*E.coli,* 81-*S.pullorum-gallinarum,* 76–*S.enteritidis* və 114- *S.tyrhi murium* kulturasını tədqiq edilmişdir. (cədvəl 1)

**Xəstəlik törədicilərinin antibiotiklərə həssaslığı**

**Cədvəl**

| Xəstəlik törədiciləri | Midqarı | Dərman maddələri | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | Provaseptol | | Doksasilin | | Amoksasilin | | Kolistin | | Gentamisin | |
| | | Cəmi | % | Cəmi | % | Cəmi | % | Cəmi | % | Cəmi | % |
| E.coli | 173 | 20 | 11,5 | 15 | 8,6 | 65 | 37,6 | 62 | 36,0 | 11 | 6,3 |
| S.pullorum gallinarum | 81 | 35 | 43,2 | 5 | 6,1 | 6 | 7,4 | 4 | 5,0 | 31 | 38,3 |
| S. enteritidis | 76 | 29 | 38,2 | 7 | 9,2 | 6 | 7,8 | 8 | 10,5 | 26 | 34,3 |
| S.tyrhi murium | 114 | 11 | 9,6 | 5 | 4,4 | 42 | 36,8 | 47 | 41,3 | 9 | 7,9 |

## Nəticə

Tədqiqatların nəticələrinə əsasən müəyyən edildi ki, həssaslığını öyrəndiyimiz *E.coli* kulturaları *amoksasilinə* 37,6 % *və kolistinə* 36,0 %*; S.pullorum-gallinarum* kulturaları *provaseptola* 43,2 % *və gentamisinə* 38,3%; *S.enteritidis* kulturaları *provaseptola* 38,2% və *gentamesinə* 34,3%; S.tyrhi murium kulturaları isə *amoksasilinə* 36,8 % *və kolistinə* 41,3%; həssas olmuşlar.

Qeyd etmək lazımdır ki, nəinki ayrı-ayrı quşçuluq təsərrüfatlarından ayrılmış kulturaların, eləcə də bir təsərrüfatdan, eyni binadan, eyni vaxtda ayrılan törədici kulturalarının antibiotiklərə həssaslıq dərəcəsində fərq aşkar edilmişdir.

Belə ki, quşçuluq təsərrüfatından 2015-ci ilin mart ayında bir quş binasından ayrı-ayrı ölmüş cücələrdən ayrılmış üç kolibakterioz kulturasından biri ancaq gentamisinə, digəri ancaq amoksasilinə, 3-cü isə ancaq provaseptola, may ayında həmin binadan ayrılan kultura isə gentamisinə, doksasilin və kolistinə həssas olmuşdur. Yaxud yenə də həmin təsərrüfatda başqa binada cücələrdən mart ayında S.enteritidis kulturası ancaq enrolinə həssas olduğu halda, may ayında ayrılan kultura amoksilinə və gentamisinə həssas olmuşdur.

Alınan nəticələr göstərir ki, quşçuluq təsərrüfatlarında mikrob mənşəli yoluxucu xəstəlik baş verdikdə ayrılmış törədici kulturalarının antibiotiklərə həssaslıq dərəcəsinin öyrənilməsi, seçilməsi və onun tətbiqinin böyük rolu olduğunu bir daha təsdiq edir.

## ƏDƏBİYYAT

1.В.В.Салаутин « Дифференциальная диагностика салмонельлеза птиц » Ветеринария № 2. 2004. стр. 22-75. С.Б.Лыско, Н.Ф. Хамко, О.А.Сунцова «Чувствительность микоплазмы и эшерихий к антибактериальным препаратам» Ветеринария № 3. 2006. стр. 31-33. 2.А.Н.Борисенкова, О.Б.Новикова, А.В.Варюхин «Эффективность применения новых антибактериальных средств в промышленном птицеводстве » Ветеринария № 6. 2006. стр.18-19. С.С.Яковлев, С.В.Лёнев « Епизоотическая ситуация и сальмонеллезам птиц в росии » Ветеринария № 6. 2008. стр.31-34. F.B.Şirinov “ Quşların xəstəlikləri” Bakı 2004. səh.73-78

### Чувствительность културы колибактериоза и салмонелйоза к антибиотикам выделенных в птицеводческих хозяйствах

**М.С.Микаилов, Г.М.Муртузов**

Длительное применение антибиотиков в лечение больных птиц вызываемых Е.коли и Сальмонеллами способствует к повышению устойчивости этих микробов, тем самым снижает эффективности лечебно-профилактических мероприятий.

Было уставлено что возбудители *E.coli* чувствительны *амоксацилину*-37,6%, и *колистину* 36,0%, *S.pullorum – gallinarum*; *провасептолу* 43,2%; *гентамицину* 38,3%; *S.enteritidis провасептолу* 38,2% *и гентамицину* - 34,3%; *S.tyrhi murium амоксацилину* – 36,8 *%; колистину* 41,3 %.

Полученные результаты ёще раз показало что, при возникновение Колибактериоза и Сальмонеллйоза лечебно профилактических мероприятий в птицеводческих хозяйствах, выборы лечебных препаратов и изучение степени чувствительность патогенных микробов к этим препаратам имеет первостепенное значение.

***Ключевые слова:*** *антибиотик, чувствительность, амоксацилин, колистин, гентамицин.*

### Sensitivity of culture colibacteriosis and salmonellaosis to antibiotics isolated in poultry farms.

**M.S.Mikailov, Q.M.Murtuzov**

Apply drugs in the treatment of diseases of birds opportunistic microbes contribute to the increased stability of these microbes, this reducing the effectiveneses of treatment and prophylactic megohm enterprises.It was found that pathogens colibacillosis sensitive amoksasin - 37,6 %; colistin - 36,0 %; S.pullorum - gallinarum provaseptol 43,2 %; gentamisin 38,3 %; S.enteritidis provaseptol 38,2%; gentomicin - 34,3%; S.tyrhi murium amoksasilin - 36,8 %; colistin - 41,3 %.

These results again showed that, with the emergence of infectious diseases treatment and prophylactic megohm enterprises in poultry, choice of therapeutic drugs and study the degree of sensitivity of pathogenic microbes to these drugs is paramount.

***Key words:*** *antibiotic, sensitivity, amoksasilin, colistin, gentomicin.*